## MÜNDƏRİCAT

## TARİX



## SOSİAL ELMLƏR VƏ HÜQUQ

**ELMAR BAXŞƏLİYEV**
*AMEA Naxçıvan Bölməsi*
*elmarbaxsaliyev91@gmail.com*

**UOT: 94 (479.242)**

# NAXÇIVAN TƏPƏ YAŞAYIŞ YERİNİN BASMA NAXIŞLI KERAMİKASI

**Açar sözlər:** *Naxçıvan, Dalma təpə, köç yolları, basma naxışlı keramika, obsidian yataqları, basma naxış, barmaq basqılı keramika*

**Keywords:** *Nakhchivan, Dalma tepe, nomadic ways, impression ornament, obsidian deposits, copper deposits, ceramics with fingerprints*

**Ключевые слова:** *Нахчыван, Дальма тепе, кочевые пути, импрессованный орнамент, обсидиановые залежи, медные залежи, керамика с отпечатками пальца*

Naxçıvan təpə yaşayış yeri Naxçıvan şəhəri ətrafında 2016-cı ildə aparılan kəşfiyyat xarakterli arxeoloji araşdırmalar zamanı, şəhərin cənub tərəfində, Naxçıvançayın sağ sahilində qeydə alınmışdır. İlk dəfə kəşfiyyat xarakterli qazılan şurflardan əldə olunan materiallar yaşayış yerinin xüsusi funksiyası olduğunu deməyə əsas verirdi. Arxeoloji qazıntıların birinci mövsümü ilk növbədə abidənin xronologiyasını müəyyənləşdirməyə, quruluşunu aydınlaşdırmağa və Eneolit dövründə yaşayış yerinin mədəni vəziyyətini müəyyənləşdirməyə imkan verdi. Yaşayış yerinin stratiqrafiyasının öyrənilməsi və buradan əldə olunan maddi mədəniyyət nümunləri, bizə bu abidənin hansı mərhələləri əhatə etdiyini, e.ə V-IV minillikləri əhatə edən Eneolit mədəniyyətinin inkişaf mərhələlərini müəyyənləşdirməyə imkan verir.

Cəmiyyətin tarixi inkişafının ən mühüm mərhələlərindən biri olan Eneolit dövrü Cənubi Qafqazda çox mühüm və bununla yanaşı sirli bir dövrdür. İndiyədək Cənubi Qafqazda yalnız son Eneolit abidələri mövcud idi. Naxçıvanda Erkən Eneolit dövrünə aid abidələrin aşkar olunması, bu tip abidələrin xarakteristikası haqqında yeni fikirlər deməyə, bölgələr arası əlaqələri, qədim köç yollarını müəyyənləşdirməyə, obsidian və mis yataqlarından istifadə haqqında ortaya yeni fikirlər qoymağa imkan verir. Tədqiqat işləri zamanı Eneolit dövrünə xas memarlıq üslübu, müxtəlif əmək alətləri aşkar olunmuşdur.

Qafqazşünas arxeoloqlardan R.M. Munçayev (3, c. 41-52), O. H. Həbibullayev (2, c. 72), İ.H.Nərimanov (4, c. 271-277), T.D.Axundov (8, p. 95-122) və digərləri Yaxın Şərq və Cənubi Qafqaz mədəniyyətləri arasındakı əlaqələr Yaxın Şərq mədəniyyətlərinin Cənubi Qafqaza yayılması ilə bağlı müxtəlif fikirlər söyləmişlər. 2017-ci ildə Naxçıvan təpə yaşayış yerində aparılan araşdırmalar, Yaxın Şərq və Cənubi Qafqaz mədəniyyətlərinin əlaqələri ilə bağlı yeni fikirlər deməyə imkan verir (1, s. 8). Naxçıvan təpənin keramika məmulatı başlıca olaraq e.ə. V minilliyin birinci yarısı üçün xarakterikdir. Keramika məmulatının əsas xüsusiyyəti Dalma təpə tipli boyalı və basma naxışlı keramikanın olmasıdır. Bu tip keramika ilə xarakterizə edilən yaşayış yeri Cənubi Qafqazda ilk dəfədir ki, aşkar olur. Naxçıvan yaşayış yerinin tədqiqi yalnız Azərbaycanın deyil, bütövlükdə bütün Cənubi Qafqazın Eneolit mədəniyyətinin ardıcıl mərhələlərini öyrənməyə imkan verir(1, s.18).

Naxçıvan təpə yaşayış yerinin tədqiqi nəticəsində indiyə qədər yalnız Urmiya gölünün cənubuna və qərbinə aid edilən, Dalma tipli keramika ilə xarakterizə edilən bu mədəniyyətin Cənubi Qafqaza, o cümlədən Azərbaycana yayıldığı müəyyənləşmiş oldu. Naxçıvan təpə yaşayış yerini xarakterizə edən əsas xüsusiyyətlərdən biri də onun basma naxışlı keramika məmulatıdır.



Şəkil 1. Barmaq basqılı keramika nümunələri.

Abidədən aşkarlanan basma naxışlı keramika nümunələri zəngin çeşidi ilə fərqlənir. Nümunələr arasında sadə, qırmızı boya ilə örtülmüş, xüsusi alətlə basma şəklində naxışlanmış və barmaq basqılı keramika nümunələri, bununla yanaşı daraq basqısı və daraqvari alətlərlə naxışlanmış nümunələr vardır. Bu tip abidələrdə basma naxışlı keramika hazırlanma üsulu və texnoloji xüsusiyyətinə görə əhəmiyyətli bir yerə malikdir. Basma naxışlı keramika nümunələri başlıca olaraq qatqısı olmayan gildən və saman qarışıq gildən hazırlanmış, qırmızı və sarı rəngin müxtəlif tonlarında boyanmışdır. Bu tip keramika məmulatını formalarına görə də bir neçə tipə bölmək olar. Birincisi tipə aid qababarıq formalı kasalarda (Şəkil: 1, 8, 9, 10, 11,12) ağız hissdə bir qədər içəri yığılmışdır. Kasalar əsasən qarışığı olmayan gildən və ya saman qarışıq gildən hazırlanmış, yaxşı bişirilmişdir. Bu kasalar adətən hər iki üzü qırmızı rəngdədir. İkinci tip kasalar silindirik-konusvari (Şəkil 1, 3, 5, 6; Şəkil 2, 4, 6, 8, 10; Şəkil 4, 6) şəkildə olan nümunələrdir. Kasaların ağız hissəsi xaricə qatlanaraq dəyirmiləşdirilmişdir. Silindirik-konusvari kasa nümunələrinində zəngin naxışlama formaları vardır.

Üçüncü tip kasalar bikonik formalı (Şəkil 1, 2, 7, 13; Şəkil 2, 1, 2; Şəkil 3, 1, 3; Şəkil 4, 1, 8) keramika nümunələri də həmçinin qatıqsız və saman qarışıq gildən hazırlanmış yaxşı bişirilmiş nümunələrdir. Bu tip qablar adətən ağız hissədə bir qədər içəri yığılmış şəkildədir. Qatıqsız gildən hazırlanan qırmızı rəngli keramika nümunələrində Eneolit dövrünün erkən mərhələsi üçün xarakterik olaraq qalın suvaq qatı vardır. Bəzi nümunələrdə gil, saman qarışığı vardır. Bu nümunələrdə də suvaq qatı qalındır. Bu tip kasa nümunələrinin xarici səthi və əsasən iç tərəfi qırmızı rəngli boyaqla boyanmış və bəzən cilalanmışdır (Şəkil 2, 6, 8). Yaşayış yerində qırmızı rəngin müxtəlif çalarlarından əlavə sarı və bəzən də bozumtul rəngli keramika nümunələrinə də rast gəlinir.



Şəkil 2. Daraqvari alətlərlə və daraq basqılı keramika nümunələri.

Naxçıvan təpə yaşayış yerindən aşkar olunan keramika nümunələrini naxışlanma üsuluna görə də bir neçə tipə bölmək olar. Bunlardan birinci tip barmaq basqılı keramika nümunələridir. Bu tip naxışlama üsuluna Sonqar Vadisi (10, p.11, fig: 2,3, p.12, fig: 5, 6,8,11,12; p.14, fig: 8, 38), Dalma Təpə (11, p. 124 fig : pl. Ic, pl. II a, d, p.125, fig: d), Lavin Təpə (12, p.116, fig: 9-I,1021,1023,172, p.117 fig: 10-I, 1069,1285), I Gabi (13, p. 242, fig. 49, 1, 2, 4, 6, 7, p. 244, fig. 50, 1, 3, 4, 5, 6, 9, 11; p. 246, fig: 51, 1, 2, p. 248, fig: 52, 1,2, p.250, fig:53, 2,3,4, p.415, fig:104, 1,2,4,5,6, p.417, fig:105,1), Kamiltəpə (9, p. 46, fig. 58), yaşayış yerlərində rast gəlmək olar. Barmaq basqılı kasa nümunələrindən birinin oturacağı da barmaq basqısı şəklində naxışlanmışdır (Şəkil 1, 3). Bu tip naxışlama üsuluna Dava Göz II (7, p. 75, fig. 11), Haji Firuz ( 16, p.123, fig. 81, a, b ) yaşayış yerlərində rast gəlinir.



Şəkil 3. Xüsusi alətlərlə naxışlanan kasa nümunələri.

İkinci tip naxışlama üsulu daraq basqılı (Şəkil 2, 1, 3, 6, 7, 8, 9, 10) keramika nümunələridir. Bu tip keramika nümunələri başlıca olaraq iri həcmli qabların parçalarından ibarətdir. Lakin onlar arasında incə hazırlanmış məişət qabları da vardır. Bu tip keramika məmulatının bəzisi sadə, bəziləri isə sarı ya da qırmızı boya ilə örtülüdür. Daraq basqıları bəzən səliqəli olub müəyyən kompozisiya yaradır, bəzən isə səliqəsiz və qarışıqdır (1, s. 21). Daraqvari alətlə naxışlanan keramika nümunələri olduqca azdır və incə daraqvari alət vasitəsi ilə naxışlanmışdır (1, s. 21; Şəkil 2, 4, 5). Bu iki tipə aid keramika nümunələri quruluşuna görə müxtəlif növləri ilə fərqlənir. Bunlardan bikonik (Şəkil 2, 1,2,5) formalı olan kasa nümunələrinin naxışlanma üsulu Eneolit dövrünə xas xüsusiyyətlər daşıyır. Bu tip qab nümunələri saman qarışıq gildən hazırlanmış yaxşı bişirilmişdir. Bəzilərin kəsiyində qara zolaq var. Bu nümunələr ağız hissədə bir qədər içəri yığılmışdır. Bu kasaların bəzilərinin hər iki üzü qırmızı boya ilə boyanmışdır (Şəkil 2, 6, 8). Kasaların xarici səthi daraqvari alətlərlə müxtəlif formada naxışlanmışdır. Bu tip naxışlama üsulu Dalma təpə mədəniyyətinə aid digər Eneolit abidələri üçün də xarakteriktir. Bu nümunələr adətən qırmızı rəngin müxtəlif tonlarında, bəzən də sarı rəngdədir. Lakin araşdırmalar göstərir ki, bu tip naxışlama uzun müddət davam etmişdir. Bu tip naxışlara Kür-Araz mədəniyyətinə aid keramika nümunələrində də rast gəlinir. Bu tip naxış Dalma təpə ( 11, p. 124, pl II, a, b, c, d,), I Gabi (13, p. 244, fig. 50, 2,7,8, p. 246, fig. 51, 3, p. 252, fig. 54, 1, 2), Culfa Kul Tepesinin VII (5, p.116, fig. 15, 1, 4; p. 119, fig. 18,6), VIB (5, p.120, fig. 19,5, p. 121, fig: 20, 10,14, p.122, fig: 21, 14), VIA (5, p.126, fig. 25, 1; p.129, fig: 28, 10), IV (5, p.146, fig: 45,3), Culfa Kul Tepesinin VII (6, p.329, fig: 6, 1), Mentesh Tepe (9, p.100, fig: 144, 7,8,10,12, p.101, fig:145, 2, p.102, fig: 146,3, p.104, fig: 148, 7,8,11,12, p.105, fig: 149,1) kimi abidələrdən məlumdur.



**Şəkil 4.** Müxtəlif üsul ilə naxışlanmış kasa və çömlək nümunələri.

Üçüncü tip naxışlama üsulu xüsusi başlıqlı alətlərlə naxışlanan keramika nümunələridir (Şəkil 3, 1, 2, 3, 4, 5, 6, 7, 8, 9,10; Şəkil 4, 1, 2, 3, 4, 5, 6, 7, 9, 10). Bu tip naxışlama üsulu ilə naxışlanan kasa və çömlək nümunələri üzərlərində olan naxışların zənginliyi ilə seçilir. Belə nümunələrə Dalma Təpə (11, p. 124, Pl. I, c, Pl. II, b,d), I Gabi (13 p. 244, fig. 50, 9,10), Lavin Təpə ( 12, p.116 fig: 9-I, 172) yaşayış yerində rast gəlirik.

Çölmək tipli qablar dörd nümunə ilə təmsil olunmuşdur (Şəkil 3,10; Şəkil:4,2,5,9 ). Çölməklər qabarıq gövdəli olub, ağız kənarları xaricə qatlanmışdır. Onların üzəri basma naxışın müxtəlif formaları ilə bəzədilmişdir.

E.ə. V minilliyin ortalarına aid (bəzən Erkən-Orta Kalkolitik adlanır) Dalma tipli keramika nümunələri Qərbi İranda Zaqros dağlarının şimal və mərkəzindəki dağlıq vadilərdə geniş yayılmışdır. Dalma ənənəsi, Mesopotamyada, Zaqrosun qərbində yayılan Ubayd 3 və Ubaid 4-ün birinci mərhələsi və ilə həmdövrdür (14, p. 97).

Buradan əldə olunan Dalma tipli keramika nümunələri, əsas olaraq, mərkəzi Zagros Dağlarından şərq və qərb istiqamətində keçən İpək yolu boyunca 100 kilometr uzunluqdakı iki vadi arasındakı beş sahədə, Royal Ontario Müzeyi qazıntıları və yerüstü araşdırmalar zamanı əldə olunmuşdur. Kangavarın şərqindəki vadidə, Dalma təbəqələri, I Gabi ve Godin Təpə də qazılmışdır. Mahidaştın qərbindəki geniş vadidə, Dalma və buna bağlı keramika nümunələri 16 abidənin səthindən tapılmışdır. Bunlardan ikisi Təpə Siahbid və Chogha Maran, üçüncüsü Təpə Koh, xüsusilə zəngin yerüstü Dalma tipli keramika nümunələri vermişdir. Bu mədəniyyətin coğrafi əhatə dairəsininin geniş olduğunu Kangavara bitişik Nehavand vadisindəki Tepe Giyan, Şimal-Şərqi İranın Ziviye bölgəsindəki Tepe Sivandan götürülən keramika nümunələri də təsdiq edir (15, p.38).

XX əsrin 80-ci illərində tədqiqatçılar belə hesab edirdi ki, Dalma mədəniyyəti Şimal-Qərbi İranda Urmiya gölünün cənub və qərbində daha geniş inkişaf etmişdir. Dalma mədəniyyəti , Dalma Təpədə müxtəlif növ monoxrom boyalı keramika, basma şəkildə naxışlanmış və sadə keramika nümunələri ilə şimali Zaqrosda Azərbaycanın Urmiya gölü bölgəsindən məlumdur. Henriksonun fikrinə görə, Orta Zaqrosda, bu nümunələr kompleksi yalnız yuxarıda təsvir edilən Kangavar və Nehavənd vadilərində, Luristanın şimal-şərqində vardır. Onun fikrinə görə Dalma tipli keramika ənənəvi olaraq İran yaylasının şərqinə doğru yayılmamış və o, cənuba doğru Cənubi Luristan və Xuzistanın cənubu ilə məhdudlaşmışdı. Xülasə Dalma tipli keramika ənənəvi olaraq mərkəzi Zaqros dağ silsiləsinin şərqindəki ərazidən tapılmışdır. Buradakı zəncirvari magistral Urmiya gölü

bölgəsinin şimalına və Şimal-Şərqi Luristana, oradanda İpək yolunun cənubuna doğru uzanır. Şimali Luristan əyalətində zəncirvari magistral, fars dilində Kuh-I Sefid, adlı bu yer Dalma mədəniyyətini təbii sərhəd kimi əhatə edir və qərb istiqamətinə yayılmasını məhdudlaşdırır. Dalma tipli basma naxışlı keramikaların yayılma arealı ayrı-ayrılıqda öyrənilməlidir. Dalma manədəniyyətinə aid bu nümunələr, Dalma boyalı keramikası və Dalma kompleksinin qalan hissəsinə görə daha geniş yayılmışdır. Dalma boyalı keramikası Dalma mədəniyyətinin digər nümunələrindən daha geniş yayılmışdır. Bu mədəniyyətin yayılma arealı başlıca olaraq zəncirvari magistralın qərbinə, İpək yolu boyunca uzanan Sahneh ve Mahidaşt vadilərinə, orta Zagrosdan qərbə, Mesopotamyadan şərqdə yerləşən İran yaylası arasındakı şərq-qərb yolu boyunca uzanır. Buna əlavə olaraq Dalma barmaq basqılı keramikaya bənzər, barmaq basqılı keramika nümunələri, İraqın şərqindəki Jebel Hamrin hövzəsindən, orta Zagros yaylaqlarının qərbindəki İpək yolu və Hamrinin şimalındakı Kərkük bölgəsindən az miqdarda əldə edilmişdir (15, s. 39).

Son illər Şimal-Qərbi İran (Cənubi Azərbaycan) və Naxçıvanda aparılan araşdırmalar göstərir ki, bu mədəniyyətin əsas mərkəzi Naxçıvan da daxil olmaqla Azərbaycanın cənub bölgələri olmuşdur. Əkinçilik və köçmə maldarlıqla məşğul olan bu tafyaların mədəniyyəti əsas mərkəzdən Urmiyanın cənubuna və Qarabağ bölgəsinə yayılmışdır (1, s. 24).

## ƏDƏBİYYAT


1. Baxşəliyev.V, Quliyeva.Z, Həşimova.T, Mehbalıyev.K, Baxşəliyev.E. Naxçıvan təpə yaşayış yerində arxeoloji tədqiqatlar. Naxçıvan: Əcəmi, 2018, 264 s.
2. Абибуллаев О.А. Энеолит и бронза на территории Нахичеванской АССР. Баку, Элм, 1982. 316 с.
3. Мунчаев Р.М., Амиров Ш.Н. Взаимосвязи Кавказа и Месопотамии в VI-IV тыс. До н.э. Международная научная конференция, 11-12 сентября 2008, Баку: Чашыоглы, 2009, с.41-52
4. Нариманов И.Г. Обеидские племена Месопотамии в Азербайджане. Тезисы Всесоюзной археологической конференции. Баку, 1985, с. 271-277.
5. Abedi A., Khatib Shahidi H., Chataigner Ch., Niknami K., Eskandari N., Kazempour M., Pirmoham-madi A., Hoseinzadeh J. And Ebrahimi GH. Excavation at Kul Tepe of (Jolfa), North-Western Iran, 2010: First Preliminary Report, Ancient Near Eastern Studies. Vol. 51, 2014, pp. 33-167.
6. Abedi A., Omrani B. and Karimifar A. Fifth and fourth millennium BC in north-western Iran Dalma and Pisdeli revisited // Documenta Praehistorica XLII, 2015, p.321-338.
7. Abedi A. Iranian Azerbaijan Pathway From The Zagros To The Caucasus, Anatolia And Northern Mesopotamia: Dava Göz, A New Neolithic And Chalcolithic Site In NW Iran. Mediterranean Archaeology and Archaeometry, Vol. 17, № 1, 2017, p.69-87.
8. Achundov T. Sites des migrants venus du Proche-Orient en Transcaucasie, in Les cultures du Caucase (Vie – IIIe millénaires avant notre ère). Leurs relations avec le Proche Orient, B. Lyonnet ed., Éditions Re-cherche sur les Civilisations, CNRS Éditions: Paris, 2007, p. 95-122.
9. Lyonnet B. And Guliyev F., Barbara Helwing B., Aliyev T., Svend H. And Mirtskhulava G. Ancient Kura 2010–2011:The first two seasons of joint field work in the Southern Caucasus. Archäologische Mitteilungen aus Iran und Turan. Band 44, 2012, p.1-190.
10. Heyderyan M., Möhsün Z., Həmid H. Kirmanşahın Sonqar vadisində Orta Kalkolitik yaşayış yerləri // Payambastanşünas, 1392, N 19, p. 1-14.
11. Hamlin C. Dalma Tepe, Iran, 13, 1975, p. 111-127.
12. Hejebri N., Binandeh A., Nestani J. And Vahdati N. H. Excavation at Lavin Tepe North-west Iran, Ancient Near Eastern Studies, Vol. 40, 2012, p. 95-117.
13. Henrickson E.F.Ceramic styles and cultural interaction in the Early and Middle Chalcolithic of the Central Zagros, İran. A Thesis submitted in conformity with the requirwmwnts for the degree of Doctor of philosophy in the University of Toronto. Toronto, 1983, p. 242-417
14. Henrickson, E. F. (1985a). An updated chronology of the Early and Middle Chalcolithic of the Central Zagros Highlands western Iran. Iran, 23, 63-108.
15. Henrickson E. F., Vitali V. The Dalma Tradition : Prehistoric Inter-Regional Cultural Integration in Highland Western Iran. In: Paléorient, 1987, Vol. 13, № 2, 1987, p. 37-45.
16. Voigt M.M. Hajji Firuz Tepe, Iran: The Neolithic Settlement. Philadelphia: University of Pennsylvania, 1983, 396 p.

**ABSTRACT**

**Elmar Bakhshaliyev**

**IMPRESSION CERAMICS OF THE SETTLEMENT NAKHCHIVAN TEPE**

As a result of the research Nakhchivan tepe are revealed the archaeological materials testifying to way of life of ancient tribes. Archaeological materials from this settlement matter for establishment of ancient nomadic ways and also communication with adjacent cultures. The settlement of Nakhchivan tepe is characterized by ceramics like Dalma tepe. Results of researches show that people moved into here at the beginning of the V millennium BC. The research of the settlement allows studying an early stage of Chalcolithic Age culture of Azerbaijan. Among finds pottery with an impression ornament, and sometimes with fingerprints has special value. The comparative analysis of pottery and also results of the analysis of coal from this settlement claim that similar ceramics can be dated 4900-4600 BC. On the basis of researches it is possible to tell that an area of dissemination of culture of Dalma tepe covered also territory of Nakhchivan. On a basis results of researches of the last years can tell that the southern regions of Azerbaijan were the homeland of this culture.

**РЕЗЮМЕ**

**Эльтар Бахшалиев**

**ИМПРЕССОВАННАЯ КЕРАМИКА ПОСЕЛЕНИЯ НАХЧЫВАН ТЕПЕ**

В результате исследования Нахчыван тепе выявлены археологические материалы, свидетельствующие об образе жизни древних племен. Археологические материалы из этого поселения имеют значение для установления древних кочевых путей, а также связи с сопредельными культурами. Поселение Нахчыван тепе характеризуется керамикой типа Дальма тепе. Результаты исследований показывают, что люди здесь заселялись в начале V тысячелетия до н.э. Исследование поселения позволяет изучить ранний этап энеолитической культуры Азербайджана. Среди находок особенное значение имеют керамические изделия с импрессованным орнаментом, а иногда с отпечатками пальца. Сравнительный анализ керамических изделий, а также результаты анализа угля из этого поселения утверждают, что подобная керамика могут датироваться 4900-4600 гг. до н.э. На основе исследований можно сказать, что ареал распространения культуры Дальма тепе охватывал также и территории Нахчыван. На основе результатам исследований последних лет можно сказать, что родиной этой культуры была южные районы Азербайджана.

---

NDU-nun Elmi Şurasının 29 mart 2018-ci il tarixli qərarı ilə çapa tövsiyyə olunmuşdur. (protokol № 07)
Məqaləni çapa təqdim etdi: AMEA-nın həqiqi üzvü İ.Hacıyev